**REYMOND KERVER**

# SEVGİDƏN BƏHS EDƏNDƏ NƏ DANIŞIRIQ

**Tərcüməçi: Ceylan Mumoğlu**



**Reymond Kerver**

**Sevgidən bəhs edəndə nə danışırıq**

**Tərtib edən:** Ceylanmumoglu.com saytı
**Tərcüməçi:** Ceylan Mumoğlu
**Redaktor:** Səbuhi Şahmursoy


## M Ü N D Ə R İ C A T

## Sevgidən bəhs edəndə nə danışırıq







*Amerika şairi və yazıçısı, hekayə və xüsusilə novella ustası Reymond Kerver 25 may 1938-ci ildə ABŞ-ın Oreqon ştatında dünyaya gəlib. XX əsrin ikinci yarısında ingilisdilli ədəbiyyatda qısa hekayələr ustası kimi tanınır. Minimalizm və realizm cərəyanlarının nümayəndəsidir. İki dəfə – 1983-1988-ci illərdə O.Henri Mükafatına layiq görülüb. Beş şeirlər toplusunun, beş hekayələr kitabının müəllifidir. Əsərlərinin motivləri əsasında və özü haqqında filmlər çəkilib. 2014-cü ildə meksikalı kinorejissor Alexandro İnarritu tərəfindən ekranlaşdırılan "Bördmən" filmində "Sevgidən bəhs edəndə nə danışırıq" hekayəsi baş qəhrəmanın dramasının çevrildiyi məqamlarda fonda səslənir. Haqqında Mark Maksvellin "Niksonkarver" romanını yazdığı Reymond Kerver 2 avqust 1988-ci ildə Vaşinqtonda vəfat edib.*

Dostum Mel Mak-Qinnis danışırdı. O kardioloqdu, ona görə də bəzən danışmağa haqqı var. Biz dördlükdə onun mətbəx masasının arxasında oturmuşduq və cin içirdik. Mətbəx çanağının arxasındakı geniş pəncərədən düşən günəş işığı buranı işıqlandırırdı. Biz dediyim – Mel, mən, onun ikinci arvadı Tereza (biz onu Terri çağırırıq) və öz arvadım Loradır. O vaxt Albukerkdə yaşayırdıq. Hərçənd, ordakıların heç biri yerli deyildi. Masada içərisində buz olan vedrə vardı. Cin və cindən düzəldilmiş kokteyl buzun ətrafında dairə vuranda biz sevgi mövzusunda danışmağa başladıq. Mel həqiqi sevgini aşağı-yuxarı mənəvi sevgi kimi başa düşürdü. Deyirdi ki, tibb institutuna getməzdən əvvəl beş il seminariyada oxuyub. Və əlavə edirdi ki, seminariyada oxuduğu illərə həyatının ən əhəmiyyətli illəri kimi

baxır.
Terri danışırdı ki, Melə qədər birlikdə yaşadığı kişi onu o dərəcədə sevirmiş ki, öldürmək istəyirmiş. Sonra Terri dedi:
– Necə oldusa, o, bir gecə məni döydü. Topuqlarımdan tutub qonaq otağına dartdı. Elə hey təkrarlayırdı: "Səni sevirəm, səni sevirəm, qancıq".
Terrinin qamış kimi nazik bədəni vardı, gözlərinin rəngi də qara. Lətif siması və çiyninə düşmüş uzun saçları olan bu qadın tısbağalı boyunbağıları və uzun sırğaları xoşlayırdı.
– Aman Tanrı, axmaq-axmaq danışma. Bu sevgi deyil, özün də bilirsən, – Mel dedi.
Bunları deyərkən məni qonaq otağında sürüyürdü. Başım hər yerə dəyirdi,
– Terri masaya göz gəzdirdi,
– Belə sevgini necə dəyərləndirirsiniz?
– Bilmirəm, buna başqa necə ad vermək olar, amma dəqiq sevgi deyil.
– Nə istəyirsən deyə bilərsən, amma bilirəm ki, bu sevgidir, – Terri dedi, – Ola bilər, sənin üçün sayıqlama kimi görünür, amma bu həqiqi idi. İnsanlar fərqlidir, Mel. Əlbəttə, bəzən dəlilik edirdi. Olsun. Amma məni sevirdi. Ola bilər, özünəməxsus tərzdə sevirdi, amma məni sevirdi. Sevgi var idi, Mel. Və demə ki, bu, belə deyil.
Mel köks ötürdü. Qədəhini götürüb Lora ilə mənə tərəf çevrildi.
– O, məni öldürməklə hədələyirdi,
– Mel dedi. Öz cinini sona qədər içib, butulkanı götürmək üçün əyildi, – Terri xüsusilə romantik insandır. Terri "Döyürsə, deməli, sevir" dünyagörüşünü özündə formalaşdırmış adamlardandır. Terri, əzizim, məsələyə belə baxmaq olmaz. Mel masanın üstündən uzanıb barmaqlarını Terrinin yanaqlarında gəzdirdi və ona gülümsədi.
– İndi o, mənə yaltaqlanır, – Terri bildirdi.
– Necə yəni, yaltaqlanır? – Mel soruşdu, – Nə üçün yaltaqlanmalıdır? Nəyi bilmək lazımdırsa, bilirəm, vəssalam.
– Ümumiyyətlə, bu mövzuya necə gəlib çıxdıq? – Terri soruşdu.
Qədəhini qaldırıb içdi, – Melin başında həmişə sevgi mövzusu fırlanır. Nədir, əzizim, düz deyil?
O gülümsədi və düşündüm ki, hər şey bitdi.

– Sadəcə mən Edin davranışını sevgi adlandırmazdım. Vəssalam, dediyim də budur, əzizim, – Mel dedi.
– Siz nə düşünürsünüz, uşaqlar? – Mel Lora ilə məndən soruşdu, – Sizcə, bu sevgidir?
– Məndən boş yerə soruşursan, – dedim, – Bu insanı heç tanımıram da. Yolüstü adını eşitmişəm. Haqqında nə bilirəm ki? Belə şeyləri təfərrüatı ilə bilməlisən. Amma mənə görə, sən deyirsən ki, sevgi mütləq olmalıdır.
– Haqqında danışdığım sevgi – bəli. Mən dediyim sevgi o sevgidir ki, sevəndə insanı öldürməyə çalışmırsan.
– Mən nə Ed haqqında, nə də baş verənlər haqqında heç nə bilmirəm. Ümumiyyətlə, başqalarının düşdüyü vəziyyət haqqında kim mühakimə edə bilər?
Mən Loranın əlini əlimin arxa tərəfi ilə sığalladım. O da əvəzində mənə qısaca gülümsədi. Loranın əlini əlimə aldım. Əli ılıqdı, mükəmməl şəkildə manikürlənmiş və cilalanmış dırnaqları göz oxşayırdı. Loranın əllərini tutdum və onu qucaqladım.
– Mən onu tərk edəndə siçovul zəhəri içdi, – Teddi dedi. Öz əlləri ilə çiyinlərini qucaqladı, – Onu Santa-fedə xəstəxanaya apardılar. O vaxt biz oradan on mil aralı yaşayırdıq. Onu xilas etdilər. Amma diş ətinə nəsə zibil bir şey oldu. Onun dişləri töküldü. Sonra da köpək dişi kimi dik çıxdı.
– Aman Tanrı, – Terri dedi. O, bir anlıq dondu, qolları yanına düşdü və qədəhini götürdü.
– İnsanlar nə oyunlardan çıxırlar! – Lora dedi.
– O, artıq oyundan kənardır, – Mel dedi, – Ölüb.
Mel limon nimçəsini mənə uzatdı. Bir dilim götürdüm, qədəhə sıxdım və buz kubcuqları barmağımla qarışdırdım.



– Hər şey çox irəli getdi, – Terri dedi, – O ağzından atəş açdı. Bununla da hər şeyi korladı. Yazıq Ed, – deyib başını yellədi.
– "Yazıq" nədir? – Mel dedi, – O, təhlükəli idi.
Mel qırx beş yaşa qədəm qoymuşdu. Arıq-qıvraq, ucaboyludu, yumşaq buruq saçları vardı. Əlləri və ayaqları tennis oynamaqdan günəşdə yanmışdı. Sərxoş vaxtı onun jestləri, hərəkətləri dəqiq və çox ehtiyatlı olurdu.
– Amma yenə də o məni sevib, Mel. Heç olmasa, bunda mənə güzəşt elə, – Terri dedi, – Cəmi bir şeyi xahiş edirəm. O məni sənin sevdiyin kimi sevməyib. Bundan bəhs etmirəm. Amma o məni sevib. Bunda mənə güzəşt edə bilərsən, ya yox?

– Sən hansı mənada dedin ki, o hər şeyi korladı? – mən soruşdum.
Lora qədəhi ilə birlikdə irəliyə doğru əyildi. Dirsəklərini masaya qoyub hər iki əli ilə qədəhi tutdu. Mənə, Melə, Terriyə baxdı. Üzündə təəccüb ifadəsi vardı, sanki dostluq etdiyi bu insanlara nəsə olmasından şübhələnir.
– O, özünü öldürməklə necə hər şeyi korladı?– mən soruşdum.
– Nə olduğunu mən sənə izah edərəm, – Mel dedi, – O, özü ilə mən və Teddini hədələmək məqsədilə aldığı iyirmi iki kalibrli tapançasını götürmüşdü. Bəli, mən ciddiyəm, o həmişə bizi hədələyirdi. Siz görsəydiniz, biz o vaxt necə yaşayırdıq. Qaçqınlar kimi. Mən, hətta özümə tapança almışdım. Buna inanırsınız? Mən ha. Vallah, almışdım. Mən tapançanı özümü müdafiə üçün almışdım və əlcək qutusunda saxlayırdım. Bəzən gecənin ortasında evdən çıxmaq lazım gəlirdi. Xəstəxanaya getmək üçün. Başa düşürsüz? O vaxt biz Terri ilə hələ evlənməmişdik. Birinci arvadım məhkəmə yolu ilə evi, uşaqları, köpəyi, hər şeyi almışdı. Və biz Terri ilə bu mənzildə yaşayırdıq. Bəzən, dediyim kimi, gecənin ortasında çağırış gəlirdi və gecə saat iki, üçdə xəstəxanaya getməli olurdum. Dayanacaq olan yer qaranlıqdı və mən maşının yanına gedənə qədər tərləyirdim. Anlamıram, o, hardan peyda oldu – kolların arasından sıçradımı, yoxsa maşından – və atəş açmağa başladı. Onu deməyə çalışıram ki, o, dəli idi. İstəsə bomba da qoya bilərdi, yaxud başqa nəsə. Nə vaxt beyninə düşsə, zəng edirdi iş yerimə və deyirdi ki, ona həkimlə danışmaq lazımdır. Mən geri zəng edəndə isə: “İt oğlu, sənin günlərin bitmək üzrədir”, – deyirdi. Bu cür hoqqalar çıxarırdı. Düzünü deyim, qorxunc idi.
– Yenə də mənim ona yazığım gəlir, – Teddi dedi.
– Vahiməli hadisədir, – Lora bildirdi, – Amma onun özünü güllələməsindən sonra konkret nə baş verdi?
Lora hüquq şirkətində katibə işləyirdi. Biz işdə tanış olmuşduq. Zamanın fərqində olmadan bir də baxdıq ki, görüşməyə başlamışıq. Onun otuz beş yaşı var, məndən üç yaş kiçikdir. Birlikdə olmaqdan xoşhallanmaq və bir-birimizi sevmək yetmirdi – birlikdə olmaqdan həm də şənlik duyurduq. Onunla rahatam.
– Nə baş verdi? – Lora soruşdu.
Mel dedi:
– O, öz otağında ağzına atəş açmışdı. Kimsə atəş səsini eşidib, idarəçiyə

xəbər vermişdi. Bir kilidaçanla gəldilər, nə baş verdiyini görəndən sonra "təcili yardım" çağırdılar. Onu gətirəndə mən işdə idim. Canlı idi, amma şüursuzdu. Üç gün yaşadı. Başı normal ölçüdən iki dəfə çox şişmişdi. Həyatımda belə şey görməmişdim və ümid edirəm, bir daha görmərəm. Teddi məsələni öyrənəndə ora gedib onun yanında oturmaq istəyirdi. Biz bu səbəbdən onunla dalaşdıq. Düşünürdüm ki, onu bu şəkildə görməsinə gərək yoxdur. Bəli, elə indi də o cür düşünürəm ki, buna ehtiyac yox idi.
– Mübahisənizi kim qazandı? – Lora soruşdu.
– O öləndə, mən palatada idim, – Terri dedi. – O heç cürə özünə gələ bilməmişdi. Ancaq mən onunla oturdum. Onun başqa kimsəsi yox idi.
– O təhlükəli idi, – Mel dedi, – Bunu sevgi adlandırmaq istəyirsənsə, öz xoşundur.
– Bu, sevgi idi, – Terri dedi, – Əlbəttə, insanların çoxunun gözündə bu normal deyildi. Amma bunun uğrunda o, ölməyə hazır idi. O buna görə də öldü.
– Lənət şeytana, mən bunu heç vaxt sevgi adlandırmaram, – Mel dedi, – Demək istəyirəm ki, bunu nəyə görə etdiyini heç kim bilmir. Çox intihar edən insanlar görmüşəm və deməzdim ki, onların bunu nəyə görə etdiyini kimsə bilir.
Mel əllərini başının arxasına qoydu və oturacaqda yırğalanmağa başladı.
– Belə sevgi mənə maraqlı deyil, – dedi, – Əgər bu, sevgidirsə, sənə xoş olsun.
Terri söylədi:
– Biz qorxurduq. Mel, hətta əvvəllər "yaşıl beretlər"də yaşayan qardaşına vəsiyyətnamə hazırlamışdı. Mel ona başına bir iş gəlsə, kimi axtaracağını bildirmişdi.
Terri qədəhindən içib dedi:
– Ancaq Mel haqlıdır. Biz qaçqınlar kimi yaşayırdıq. Qorxurduq. Mel qorxurdu. Elə deyil, əzizim? Bir dəfə, hətta polisə də zəng etmişdim, ancaq onlardan fayda yox idi. Dedilər ki, Ed hələ nəsə törətmədiyi müddətdə biz heç nə edə bilmərik. Gülməlidir, hə?
O, cinin qalanını da qədəhinə süzüb, butulkanı yellədi. Mel masadan qalxıb bufetə getdi. Yeni butulka gətirdi.
– Biz Niklə bilirik, sevgi nədir, – Lora deyib dizlərini mənim dizimə

dürtüşdürdü, – O mənada ki, bizim üçün nədir. İndi də sən nəsə deməlisən.
Onun bu sözlərinə cavab olaraq əllərini dodaqlarımda gəzdirdim. Əl öpmək üzrə təmtəraqlı tamaşa göstərdim. Hər kəsin ürəyincə oldu.
– Bəxtimiz gətirib, – dedim.
– Di uşaqlar, – Terri dedi, – Bəsdirin, ürəyim bulandı. Sizdə hələ bay ayı bitməyib. Tanrı bağışlasın, siz hələ ki, sabun köpüyündə üzürsünüz. Hələ gözləyin. Neçə vaxtdır birlikdəsiniz? Nə qədər zaman keçib? Bir ildən çox?
– Tezliklə yarım il olacaq, – Lora qızarıb gülümsəyərək dedi.
– Deyirəm də, – Terri bildirdi, – Bir qədər gözləyin.
O, qədəhi əlində diqqətlə Loraya baxırdı.
– Zarafat, zarafat, – Terri dedi.
Mel cin butulkasını açdı və masanı dolaşdı.
– Belə, uşaqlar, – dedi, – Gəlin, tost deyək. Mən sevginin şərəfinə tost deyəcəyəm. Həqiqi sevginin.
Qədəhlərimizi toqquşdurduq.
– Sevginin şərəfinə, – dedik.
Hardasa arxa həyətlərin birində it hürdü. Pəncərəyə yapışmış ağcaqayın yarpaqları şüşəni danqıldadırdı. Günortadan sonrakı günəş içəri daxil olub, elə bil dinclik və bolluq rəmzi kimi, əzəmətli işığını otağa saçırdı. Biz hər yerdə özümüzü ovsunlanmış vəziyyətdə hiss edirdik. Sanki qadağan edilmiş şeylər barədə razılığa gəlmiş uşaqlar kimi qədəhləri yenidən qaldırıb təbəssümlə içirdik.
– Mən sizə deyim, həqiqi sevgi nədir, – Mel dedi, – Daha doğrusu, yaxşı nümunəm var. Axırda özünüz nəticə çıxararsınız.
O qədəhinə yenə cin süzdü. Buz və limon dilimi əlavə etdi. Biz də öz kokteyllərimizi süzərək gözlədik. Loranın dizləri ilə mənim dizlərim yenə toqquşdu. Əlimi onun isti ombasına qoyub eləcə saxladım.
– Bizlərdən kim sevgi haqqında əslində nə bilir? – Mel dedi, – Mənə görə, biz sevgidə naşıyıq. Biz deyirik ki, bir-birimizi sevirik. Elədir ki var, şübhə etmirəm. Mən Terrini sevirəm, Terri də məni sevir və siz də, uşaqlar, bir-birinizi sevirsiniz. Siz bilirsiniz mən hansı sevgidən danışıram? Fiziki sevgi sizi müəyyən insana

yönəldən impulsdur, həmçinin faktiki mövcud olan nəsnəyə olan sevgidir. Ehtiraslı sevgi, yaxud sentimental sevgi, deyək, başqasına qarşı olan gündəlik maraqdır. Ancaq bəzən mənə bu faktı qəbul etmək çətindir ki, bəlkə, mən birinci arvadımı da sevmişəm. Amma belə də olub, bilirəm ki, sevmişəm. Odur ki, yəqin, bu mənada Terriyə oxşayıram. Edlə Terriyə, – O, bir qədər düşüncəyə daldı və davam etdi, – Vaxt vardı, düşünürdüm ki, birinci arvadımı həyatımdan çox sevirəm. Amma indi bütün varlığımla nifrət edirəm. Nifrət etmək. Bunu necə izah edəsən? O sevgi hara getdi? O sevgi hara yox oldu, bunu bilmək istəyirəm. Biri mənə desin. İndi Edi götürək. Yaxşı, Edə qayıtdıq. O, Terrini elə sevirdi ki, onu öldürməyə çalışırdı və axırda da özünü öldürdü, – Mel susub, qədəhdən qurtum aldı, – Siz, uşaqlar, yarım ildir birlikdəsiniz və bir-birinizi sevirsiniz. İşıq saçdığınız alnınıza yazılıb. Amma siz ikiniz də rastlaşana qədər başqa insanları sevmisiniz. Hər ikiniz əvvəllər nikahda olmuşunuz – mənimlə Terri kimi. Ola bilər ki, hətta ona qədər başqa kimisə də sevmisiniz. Biz Terri ilə beş ildir birlikdəyik, onun dörd ilinə evliliyimiz daxildir. Və dəhşət, dəhşət ondadır ki, hərçənd bu da yaxşıdır, təsəlliverici fikirdir, əgər bizdən birinə nəsə olsa, – bağışlayın ki, bunu deyirəm – əgər sabah birimizə nəsə olsa, düşünürəm ki, digərimiz bunu çox az dərd edəcək, bilirsiniz, sağ qalan tərəf kifayət qədər tez özünü toplayacaq, yenidən sevəcək və tezliklə özünə başqa kimisə tapacaq. Bütün bunlar, haqqında danışdığımız bütün bu sevgi yalnız xatirə kimi qalacaq. Bəlkə, heç xatirə kimi də qalmayacaq. Düz demirəm? Boş danışıram? Əgər səhvim varsa, düzəltmənizi istəyirəm. Öyrənmək istəyirəm. Yəni,
heç nə bilmədiyimi etiraf edirəm.

– Mel, Tanrı xatirinə, – Terri dedi. O əyildi və Melin əlindən tutdu, – Sənə nolub, sərxoşsan? Hə, əzizim, sərxoşsan?

– Əzizim, mən oturmuşam və danışıram. Məgər nə düşündüyümü demək üçün sərxoş olmağım vacibdir? Biz ki hamımız oturmuşuq və danışırıq. Düzdür? – Mel nəzərini onda saxlayaraq dedi.

– Canım, mən tənqid etmirəm, – deyən Terri qədəhi götürdü.

– Mən bu gün çağırışda deyiləm, – Mel bildirdi, – İcazə verin, xatırladım, mən bu gün iş növbəsində deyiləm.

– Mel, biz səni sevirik, – Lora dedi.

Mel Loraya baxdı. Elə baxdı ki, elə bil o, əvvəl tanıdığı Lora deyildi, başqası idi.
– Mən də səni həmçinin, Lora, – Mel dedi, – Və səni də, Nik, səni də sevirəm. Bilirsiniz, nə var? Siz, uşaqlar, bizim dostlarımızsınız, və qədəhi götürüb davam elədi, – Mən sizə bir hadisəni danışmağa hazırlaşırdım. Sübut kimi. Bilirsiniz, bu, bir neçə ay əvvəl baş versə də, hələ davam edir və biz bundan utanmalıyıq. Ona görə ki, elə danışırıq, elə bil sevgi haqqında hər şeyi bilirik.
– Bəsdir, – Terri dedi, – Əgər sərxoş deyilsənsə, sərxoşlar kimi danışma.
– Heç olmasa, bir dəfə də olsa mumla, – Mel çox təmkinlə bildirdi, – Bir dəqiqəlik mənə lütf et. Deməli, nədən danışırdım, ordakı qocalar, cütlük şosedə qəzaya düşmüşdülər. Gənc oğlan sürətlə onlara çarpılıb, onlar da pis günə qalmışdılar. Heç kim inanmırdı ki, onların sağ qalmaq şansı var.
Terri əvvəl bizə baxdı, sonra yenə Melə zilləndi. O çox həyəcanlı idi. Mel butulkanı dairə boyu gəzdirmək üçün verdi.
– O gecə mən çağırış üçün getmişdim. Aylardan may idi, ya da iyun. Terri ilə yenicə şam etməyə oturmuşduq ki, xəstəxanadan zəng vurdular. Bu hadisə trasda baş vermişdi. Yaşı hələ iyirmiyə çatmamış sərxoş gənc atasının pikap maşınıyla qocaların bağ furqonuna girmişdi. Yaşlı cütlüyün 75 yaşları olardı. 18-19 yaşlı gənc yerindəcə keçinmişdi. Sükan döş qəfəsinə girmişdi. Qocalar isə sağ idilər, təsəvvür edirsiniz? Yəni, güclə sağ qalmışdılar. Hər ikisində çoxsaylı sınıqlar, daxili orqanların zədələnməsi, qanaxma, kontuziya, yırtıq yaralar, kəsiklər vardı. İnanın, onlar dəhşətli vəziyyətdə idilər. Və əlbəttə ki, yaş da onların xeyrinə deyildi. Deyərdim ki, qarıya daha çətin oldu, nəinki yoldaşına. Dalaq yırtılmışdı, hər iki diz qapağı sınmışdı. Təhlükəsizlik kəmərini taxmışdılar, elə onları xilas edən də bu olmuşdu.
– Yoldaşlar, bu, Yol Təhlükəsizliyi Şurasının reklamıdır, – Terri dedi, – Sizinlə danışan rəsmi nümayəndəmiz doktor Melvin R.Mak-Qinnisdir, – deyib güldü, – Mel, bəzən çox dərinə gedirsən. Amma səni sevirəm, əzizim.
– Əzizim, mən də səni sevirəm, – Mel söylədi.
O, masanın üzərindən əyildi. Terri də ona qarşı əyildi. Öpüşdülər.
– Terri haqlıdır, – Mel yenidən əyləşərək dedi, – Kəmərlərinizi

taxmağı unutmayın. Açığı, o qocaların bəxti gətirmişdi. Mən ora çatanda, dediyim kimi, gənc artıq ölmüşdü. Köşədəki xərəkdə idi. Qocalara nəzər yetirdikdən sonra, qəbul otağında olan tibb bacısına dedim ki, mənə dərhal nevropotoloq, ortoped və iki cərrah çağırsın. O, qədəhindən qurtum aldı.
– Çalışacağam ki, qısa edim. Kəsə kəlmə, biz onları əməliyyat otağına apardıq və üzərlərində bütün gecəni fasiləsiz işlədik. Onların hər ikisinin orqanizmi inanılmaz enerjiyə malik idi. Belə şeylər həmin dəqiqə görünür. Ona görə də, biz əlimizdən gələni etdik, səhərə yaxın onların yaşamaq şansını əlli-əlliyə dəyərləndirdik, qadınınkı nisbətən daha az idi. Beləliklə, onlar hər ikisi növbəti səhərə sağ çıxdılar. Onları intensiv terapiya otağına köçürdük, iki həftə aparatlara bağlı vəziyyətdə qaldılar. Bütün göstəricilərə görə, hər şey yaxşıya doğru getdi. Buna görə də, onları palataya köçürdük,
– Mel bir anlıq susub, davam elədi, – Bax belə, gəlin, bu ucuz cini içib bitirək. Sonra gedək şam yeməyinə. Mən və Terri yeni bir yer kəşf etmişik. Həmin tanıdığımız yerə gedəcəyik. Amma bu ucuz və pis cini bitirək, sonra gedək.
Terri dedi:
– Biz hələ orda nahar etməmişik. Ancaq yaxşı görünür. Çöldən. Bilirsinizmi?
– Nahar etməyi xoşlayıram, – Mel dedi, – Yenidən başlamalı olsaydım, aşpazlığa gedərdim. Düzdür, Terri?
O güldü. Barmağı ilə qədəhindəki buzları qarışdırdı.
– Terri bilir, Terri sizə danışacaq. Ancaq mən bunu demək istəyirəm: əgər keçmişə, başqa zamanlara qayıtmaq mümkün olsaydı, bilirsiniz kim olardım? Mən cəngavər kimi qayıdardım. Zirehlərin içində təhlükəsiz olardım. Cəngavərlər üçün heç də pis deyildi, barıt və muşketli tapançalar çıxana qədər.
– Mel əlində nizə tutub, at çapmaq istərdi, – Terri dedi.
– Özü ilə hər yerə qadın yaylığı götürərək, – Lora əlavə elədi.
– Ya da qadının özünü, – Mel dedi.
– Utanmaz, – Lora söylədi.
– Tutaq ki, sən kəndli bədənində geri qayıtmısan. Amma o dövrdə kəndlilərin həyatı ağır idi, – Terri dedi.
– Kəndlilərin həyatı bütün dövrlərdə ağır olub, – Mel bildirdi, –

Amma fikrimcə, hətta cəngavərlər də kimlərinsə vestalları olublar. Sistem belə deyildi? Əvvəl-axır hər kəs kiminsə vestalıdır. Belə deyil? Terri? Cəngavərlərdə xoşuma gələn nə idi, xanımlarından fərqli olaraq onların yaraq-yasağı vardı və onlara zərər vermək asan deyildi. Bilirsiniz də, o zaman maşın yox idi. Arxadan dalınıza dəyən sərxoş gənclər də yox idi.
– Vassallar, – Terri dedi.
– Nə? – Mel soruşdu.
– Vassallar. Onlar vassallar adlanırdı, vestallar yox.
– Vassallar, vestallar. Əşşi, nə fərqi var? Nə demək istədiyimi sən başa düşdün. Yaxşı, cüclü təhsilim yoxdur. Özüm öyrənmişəm. Əlbəttə, mən kardioloq-cərraham, amma sadəcə texnikəm. Ora gedirəm, əlləşib-vuruşuram, təmir edirəm. Lənət olsun!
– Təvazökarlıq sənə yaraşmır, – Terri dedi.
– O, sadəcə dəyərsiz bir sınıqçıdır, – dedim, – Amma bəzən onlar bütün bu yaraq-yasaqda boğulurdular, Mel. Hava çox isti olanda onlarda, hətta ürəktutma da olurdu və yorulur, əldən düşürdülər. Hardasa oxumuşdum, onlar atdan yıxılanda bütün bu zirehlərlə birlikdə qalxa bilmirdilər. Bəzən öz atlarının ayaqları altında əzilirdilər.
– Bu dəhşətdir, – Mel dedi, – Bu ki, qorxuncdur, Niki. Yəqin, orda uzanıb gözləyirdilər ki, kimsə onlardan kabab çəkəcək.
– Hansısa başqa vestal, – Terri dedi.
– Eynən, – Mel razılaşdı, – Hansısa vassal gəlib bədbəxti sevgi uğuruna nizə ilə vuracaq. Və ya həmin vaxtda nə uğrunda döyüşdüklərinə görə.
– Bizim indi döyüşdüyümüz şey uğrunda,– Terri dedi.
Lora bildirdi:
– Heç nə dəyişməyib. Allıq hələ də Loranın yanaqlarından getməmişdi. Gözləri parıldayırdı. O qədəhi dodaqlarına doğru apardı.
Mel öz qədəhinə yenidən süzdü. Diqqətlə etiketə baxaraq uzun sıra nömrələrini öyrənməyə çalışdı. Sonra yavaşca butulkanı masanın üstünə qoydu və yavaşca qazlı içkiyə doğru əyildi.
– Qocaların axırı noldu? – Lora soruşdu, – Söhbətin yarımçıq qaldı.
Lora heç cürə siqaret çəkə bilmirdi. Kibritlər bir-birinin ardınca sönürdü. Otaqda günəşin işığı dəyişmiş, öləzimişdi. Ancaq pəncərənin arxasındakı yarpaqlar əvvəlki kimi əsirdi, mən onların pəncərədə və mətbəx dəzgahı

üzərində saldığı naxışları seyr edirdim. Naxışlar, əlbəttə ki, fərqli idi.
– Qocalara nə oldu? – mən soruşdum.
– Yaşlı, amma müdrik, – Terri dedi.
Mel baxışlarını ona zillədi.
Terri dedi:
– Davamını danış, əzizim. Zəhlətökənliyimə fikir vermə. Sonra nə oldu?
– Bilirsən, nə var, Terri? – Mel soruşdu.
– Mel, xahiş edirəm, – Terri dedi, – Niyə belə həmişə ciddisən, sevgilim? Zarafat başa düşmürsən?
– Zarafat bunun harasındadır? - Mel baxışlarını Loraya çevirərək dedi: – Lora, əgər mənim Terrim olmasaydı, mən Terrini belə güclü sevməsəydim və əgər Nik də mənim ən yaxşı dostum olmasaydı, mən sənə aşiq olardım. Səni oğurlayardım, əzizim, – o dedi.
– Davamını danış, – Terri dedi, – Sonra da nahar etmək üçün yeni restorana gedək.
– Yaxşı, – Mel dedi, – Harda qalmışdım? – masaya baxdı, sonra danışmağa başladı, – Mən hər gün onlara baş çəkirdim: bəzən iki dəfə, hətta çağırışda olsam belə. Hər ikisi başdan-ayağa gips və sarğılarda idi. Filmlərdə görmüsünüz də. Bax, onların görünüşləri eynən kinolardakı kimi idi. Deliklər yalnız gözlər, burun və ağız üçün açılmışdı. Qadının ayaqları da çəkilib uzadılmışdı. Amma əri uzun depressiyada idi. Arvadının sağ qaldığını öyrənəndə belə, depressiyası davam elədi. Qəza səbəbindən deyil. Daha doğrusu, qəza hamısı demək deyildi. Qulağımı onun dəlikdən görünən ağzına doğru yaxınlaşdıranda, o dedi ki, bu qəzaya görə deyil, arvadını dəlikli gözlərin arxasından görə bilmədiyi üçündür. Sən demə, buna görə o, özünü bu qədər pis hiss edirmiş. Təsəvvür edirsiniz? Ciddiyəm, qocanın ürəyi parçalanırdı ki, özünün lənətəgəlmiş başını çevirib, lənətəgəlmiş arvadına baxa bilmir.
Mel bizə doğru baxdı və başını yellədi. Elə bil deyəcəyi fikrə qarşı heyrətlənirdi.
– Yəni, bu qoca kaftarı öz qarısına baxa bilməməyi öldürürdü, lənət şeytana!
Hamımız Melə baxdıq.

– Məni başa düşdünüz? Bəlkə, həmin vaxt biz bir qədər sərxoş idik. Diqqəti cəmləməyin çətin olduğunu xatırlayıram. İşıq tədricən otaqdan çıxıb pəncərənin arxasına, gəldiyi yerə qayıdırdı. Amma işığı yandırmaq üçün heç kim yerindən tərpənmirdi.
– Görün, nə deyirəm, – Mel dedi, – Gəlin, bu zəhrimar cini içib bitirək. Burda hər kəsə çatacaq qədər var. Sonra isə yeməyə gedərik. Yeni restorana.
– Mel depressiyadadır, – Terri dedi, – Mel, niyə həb atmırsan?
Mel başını yellədi.
– Onların hamısını udmuşam.
– Zaman-zaman hamımızın dərmana ehtiyacı var, – dedim.
– Bəzi insanların ona doğuşdan ehtiyacı var, – Terri dedi.
O, barmağı ilə masadan nəyisə sildi. Sonra silməyini dayandırdı.
– Uşaqlarıma zəng edim, – Mel bildirdi, – İcazənizlə, uşaqlarıma zəng edəcəyəm.
Terri dedi: – Əgər dəstəyi Marcori götürərsə? Uşaqlar, siz Marcori barədə eşitmisiniz? – Əzizim, sən ki bilirsən, Marcori ilə danışmamalısan. Pis olacaqsan.
– Marcori ilə danışmayacağam, – Mel dedi, – Amma uşaqlarla danışmaq istəyirəm.
– Elə bir gün yoxdur ki, Mel onun tezliklə yenidən ailə qurması haqqında danışmasın. Ya da ölməsi haqqında, – Terri dedi, – Birincisi, o, bizi talan edir. Mel deyir ki, o qəsdən ərə getmir. Onun özü və uşaqları ilə birlikdə yaşayan dostu var, odur ki, Mel həm də onun dostunu saxlayır. Onun arılara qarşı allergiyası var. Əgər onun yenidən ərə getməsinə dua etmirəmsə, arıların onu ölənədək sancmasına dua edəcəyəm.
– Utanmaz, – Lora dedi.
– Jjj-jjj, – Mel barmağı ilə arıları canlandırarkən, Terri də vızıltı səsi çıxarırdı.
Sonra əllərini yana saldı.
– O qudurğandır, – Mel dedi, – Bəzən istəyirəm, ora arıçı paltarında gedim. Bilirsiniz də, üzü örtmək üçün şlyapa var, önündə cunası olan dəbilqə kimi, iri əlcəklər və sırınmış plaş. Qapını döyüb arı pətəyini evə buraxacağam.

O, ayağını ayağının üstünə aşırdı. Deyəsən, bu, onun xeyli zamanını aldı. Sonra hər iki ayağını döşəməyə uzatdı, masanın üzərinə irəli əyilib dirsəkləndi, əllərini çənəsinin altında dayadı.
– Bəlkə, uşaqlara zəng eləməyim? Bəlkə, dərd etməyim? Bəlkə, sadəcə gedib yemək yeyək? Nə deyirsiniz?
– Mən "hə" deyirəm, – dedim, – Yeyək, yaxud yeməyək. Ya da yenə içək. Günəş batana qədər oturaram.
– Nə mənada, əzizim? – Lora dedi.
– O mənada ki, davam etməyə hazıram. Mənası budur.
– Mən də nəsə yemək istəyirəm, – Lora dedi, – Məncə, həyatımda bu qədər ac olmamışam. Yeməyə bir şey var?
– Mən kreker və pendir gətirərəm, – Terri bildirdi.
Amma Terri oturduğu yerdə qalmışdı. Ayağa qalxıb nəsə gətirmədi. Mel qədəhini çevirib içindəkinin hamısını masanın üstünə tökdü.
– Cinə son! Terri dedi:
– Bəs sonra?
Ürəyimin döyüntüsünü eşidirdim. Hər kəsin ürəyinin döyüntüsünü eşidirdim. Heç kim tərpənməsə də, hətta otağı qaranlıq bürüsə də, çıxardığımız səslər qulaqlarımda guruldayırdı.

**İvan Bunin - "Yüngül nəfəs"**



Qəbiristanlıqda təzə gilli qum təpənin üstündə palıd ağacından düzəldilmiş yeni xaç var – möhkəm, ağır, hamardır.

Aylardan apreldir, günlər bozarıb; geniş rayon qəbiristanlığının başdaşları çox uzaqda çılpaq ağacların arasından görünür və soyuq külək xaçın ətəyindəki saxsı çələngin içərisində fit çalırdı.

Xaçın üstünə kifayət qədər böyük, qabarıq çini medalyon keçirilib, medalyondasa – sevincli, valehedici, canlı gözləriylə baxan gimnaziya tələbəsinin fotosu var.
Bu Olya Meşerskayadır.
Qəhvəyi rəngli gimnaziya donları geyinmiş çoxsaylı qızlardan heç nəyi ilə fərqlənmirdi: onun haqqında nə demək olardı: qəşəng, zəngin və xoşbəxt qızlardandı, təkcə dəcəlliyi vardı və müdirəsinin nəsihətlərinə qarşı diqqətsizdi. Sonra o, çiçəklənməyə başladı, günlərlə deyil, saatlarla. On dörd yaşında onun incə beli və qamətli ayaqları üstündə sinəsi və bütün əndamı insanın hələ heç vaxt sözlə ifadə edə bilmədiyi cazibədarlıqla görünürdü; on beş yaşında artıq gözəlliyi ilə tanınırdı. Bəzi rəfiqələri diqqətlə daranırdılar, çox təmizkardılar, öz hərəkətlərini necə təmkinlə izləyirdilər! Amma o, heç nədən qorxmurdu – nə barmaqlarındakı mürəkkəb ləkəsindən, nə dağılmış saçlarından, nə də qaçarkən yıxılanda sıyrılmış dizindən. Heç bir qayğı, səy olmadan hər şey ona necəsə mübhəm gəldi və son iki ildə gözəlliyi, zərifl iyi, qoçaqlığı, gözlərinin canlı parıltısı onu bütün gimnaziyadan fərqləndirdi... Ballarda heç kim Olya Meşerskaya kimi rəqs etmirdi, heç kim konki üzərində onun kimi qaçmırdı, ballarda heç kimə onun qulluğunda dayandıqları qədər xidmət göstərmirdilər və nəyə görəsə kiçik sinifl ər heç kimi onu sevdikləri qədər sevmirdilər. O, sanki qəfildən gənc qıza çevrildi və fərq edilmədən gimnaziyada şöhrəti artdı. Dedi qodu yayıldı ki, onun ayağı sürüşkəndir, pərəstişkarlarsız yaşaya bilmir, tələbə Şenşin ona dəlicəsinə aşiq olub, guya Olya da onu sevir, amma münasibətində dəyişkən olduğu üçün Şenşin intihara cəhd edib.


"Yüngül nəfəs" hekayəsi üçün çəkilmiş illüstrasiya

Olya Meşerskayanın son qışında haqqında gimnaziyada danışırdılar ki, şadlığından tamamilə dəli olub. Qış qarlı, günəşli, şaxtalıydı, yüksək küknar ağacları olan qarlı gimnaziya bağı arxasında günəş erkən qüruba enir, hər zaman mülayim, şəfəqli, sabaha da şaxta və günəş vəd edirdi. Baş kilsə yolunda gəzinti, şəhər bağında buz meydançası, çəhrayı qürub və musiqi müşayiətilə bütün bu kütlə arasında sürüşən Olya Meşerskaya ən qayğısız, ən xoşbəxtlərdəndi. Və bir dəfə böyük tənəffüsdə toplantı zalında onun arxasınca düşmüş fərəhlə ciyildəyən birinci sinif tələbələrindən yel kimi qaçanda, gözlənilmədən müdirənin yanına çağırdılar. Olya sürətlə qaçandan sonra dayandı, dərindən nəfəs aldı, cəld və artıq vərdiş etdiyi qadınlara məxsus hərəkətiylə saçlarını düzəltdi, önlüyünün künclərini çiyinlərinə doğru çəkdi və parlayan gözləriylə yuxarı qaçdı. Cavan görünüşü olsa da, saçları ağarmış müdirə çar portretinin altında, yazı masası arxasında əlində nəsə toxuya- toxuya sakitcə oturmuşdu.

– Salam, madmazel Meşerskaya, – gözlərini əlində toxuduğu şeydən ayırmadan fransızca dedi. – Təəssüfl ə qeyd edirəm, artıq birinci dəfə deyil ki, davranışlarınız haqqında danışmaq üçün sizi bura çağırmağa məcbur qalıram.

– Dinləyirəm, madam, – Meşerskaya cavab verdi. Eyni zamanda simasında heç bir ifadə olmayan aydın, canlı baxışlarla ona baxaraq elə xəfif və vüqarla oturdu ki, bunu ancaq o edə bilərdi.

– Təəssüf ki, məni yaxşı dinləmirsiniz, bundan əmin oldum, – müdirə dedi. Sapı çəkdi və yumaq cilalanmış döşəmə üzərində fırlananda Meşerskaya maraqla ona baxdı. Müdirə gözlərini qaldırdı.

– Mən təkrarlamayacağam, uzun danışmayacağam, – dedi. Şaxtalı günlərdə parlaq holland sobasının istiliyinin və yazı masasındakı inciçiçəklərinin təzəliyinin hədsiz gözəl qoxuduğu bu qeyri-adi təmiz və böyük otaq Meşerskayanın çox xoşuna gəldi.

Gənc çarın işıqlar içindəki salonun ortasında dayanarkən rəsm edilmiş boy uzunu portretinə və müdirə xanımın səliqə ilə burulmuş süd rəngli saç ayrımı cizgisinə baxaraq səbrlə susdu.

– Artıq kiçik qız deyilsiniz, – çox mənalı tərzdə əsəbiləşərək dedi.
– Bəli, madam, – Meşerskaya, demək olar, şən cavab verdi.

– Amma qadın da deyilsiniz, – müdirə mənalı-mənalı izah elədi və onun tutqun üzü xəfi fl ədi. – Hər şeydən əvvəl, bu nə saç düzümüdür? Bu, qadınlara aid saç düzümüdür!


“Yüngül nəfəs” hekayəsi üçün çəkilmiş illüstrasiya

– Yaxşı saçlarım olduğu üçün günahkar deyiləm, madam, – Meşerskaya qəşəng yığılmış saçlarına iki əliylə toxunaraq bildirdi.
– Ah, belə deyin, siz günahkar deyilsiniz! – müdirə dedi. – Siz saç düzümünə görə günahkar deyilsiniz, bahalı şanalara görə günahkar deyilsiniz, amma iyirmi rublluq ayaqqabılarla valideynlərinizi viran edirsiniz! Ancaq təkrar edirəm, siz tamamilə unudursunuz ki, gimnaziya şagirdisiniz...
Və bu yerdə Meşerskaya öz sadəliyi və sakitliyini itirmədən nəzakətlə onun sözünü kəsdi:

– Bağışlayın, madam, siz səhv edirsiniz: mən qadınam. Və bunda günahkar, bilirsiniz, kimdir? Atamın dostu və qonşusu, sizinsə qardaşınız Aleksey Mixayloviç Malyutin. Bu, keçən yay kənddə olmuşdu...

Bu söhbətdən bir ay sonra, yaraşıqsız və rəiyyət görünüşlü, Olya Meşerskayanın aid olduğu dairəyə heç bir uyğunluğu olmayan kazak

zabiti vağzalın platformasında qatarla yeni gəlmiş camaatın arasında onu güllələdi. İnanılmazdır ki, Olya Meşerskayanın müdirəni heyrətləndirmiş etirafı təsdiqləndi: zabit müstəntiqə bildirdi ki, Meşerskaya özünü ona cəlb etdirib, onunla yaxınlıq edib, arvadı olacağına and içib və qətl günü, vağzalda onu Novoçerkaska yola salarkən, birdən deyib ki, heç zaman onu sevdiyini düşünməyib, bütün bu nikah haqqındakı danışıqlar istehza idi və ona Malyutindən bəhs edən gündəliyin bir səhifəsini oxumağa verib.

– Mən bu sətirləri tələsik oxudum, dərhal onun gəzdiyi və mənim oxuyub bitirməyimi gözlədiyi platformada atəş açdım, – zabit dedi. – Gündəlik budur, baxın, görün, orda keçən ilin on iyulunda nə yazılmışdı.

Gündəlikdə bunlar yazılmışdı:
"İndi gecə saat ikidir. Mən bərk yatmışdım, amma o dəqiqə də oyandım... İndi mən qadın oldum! Atam, anam və Tolya, hamısı şəhərə getdilər və mən tək qaldım. Tək qaldığım üçün elə xoşbəxt idim ki! Səhər bağda, tarlada, meşədə gəzdim, mənə elə gəlirdi ki, bütün dünyada təkəm və həyatımda heç vaxt bu cür yaxşı düşünməmişdim. Naharı da tək etdim, sonra bir saat musiqinin müşayiəti ilə rəsq etdim, məndə elə hiss yarandı ki, sanki sonsuza qədər yaşacağam və xoşbəxt olacağam. Sonra atamın kabinetində mürgülədim və saat dörddə Katya məni oyadıb dedi ki, Aleksey Mixayloviç gəlib.Onun gəlişinə sevindim, onu qəbul etmək və yanında olmaq elə xoşuma gəlirdi ki. O, özünün Vyatka atlarıyla gəlmişdi, onlar artırmada dayanmışdılar. O, bizdə qaldı, çünki yağış yağırdı və o, istəyirdi ki, atlar axşama qədər qurusun. Atamı evdə tapmadığı üçün məyus oldu, çox canlanmışdı, özünü mənim kavalerim kimi aparırdı, mənə aşiq olduğu haqda çox zarafat edirdi. Çaydan əvvəl bağda gəzəndə yenə də gözəl hava vardı, günəş bütün islanmış bağın arasından parlayırdı, amma çox soyuq idi, o, mənim əlimdən tutaraq aparır və deyirdi ki, mən Marqaritanın əlindən tutmuş Faustam. Onun əlli altı yaşı vardı, amma çox yaraşıqlıydı və həmişə qəşəng geyinirdi – xoşuma gəlməyən cəhəti plaş-paltoda gəlməsi idi – ingilis odekalonu qoxuyurdu, gözlərisə "təmamən gənc, qara rəngdə, saqqalı isə zərifcə iki uzun hissəyə ayrılmışdı və tam gümüş rəngdə idi. Çay süfrəsi zamanı şüşə eyvanda oturduq,

özümü nəsə naxoş hiss etdim və taxta uzandım. O isə siqaret çəkirdi, sonra yanımda oturdu, cürbəcür nəzakətli sözlər dedi, baxdı, baxdı və əlimi öpdü. Mən üzümü ipək dəsmalımla örtdüm və o bir neçə dəfə dəsmalın üstündən dodaqlarımdan öpdü... Başa düşmürəm, bu necə baş verdi, dəli olmuşdum, heç vaxt düşünməmişdim ki, mən beləyəm! İndi mənim bir çıxış yolum var... Ona elə nifrət edirəm ki, buna dözə bilmirəm!.."

Aprel günlərində şəhər təmizlənmişdi, yerdəki daşlar ağarmış, onların üzərində yerimək yüngül və xoş olmuşdu. Hər bazar günü, ibadətdən sonra şəhərin çıxışına aparan baş kilsə küçəsi boyu matəmə bürünmüş balaca qadın gedir. Onun qara laykadan əlcəkləri, qara ağacdan düzəldilmiş çətiri var. O, şose üzərində çoxlu hisli dəmirçixana olan natəmiz meydanı keçir, təzə-tər tarla havası əsir; sonra kişi monastırı və dustaqxana arasından buludlu səmanın üfüqləri ağarır, bahar tarlaları bozarır və sonra monastır divarlarının altındakı gölməçələr arasına çatanda sola dönürsən, böyük, alçaq bağ görünür. Bağın ətrafına ağ hasarlar çəkilib, üzərinə də "Məryəmin ölümü" yazılıb. Balaca qadın xaç çəkir və adəti üzrə əsas xiyaban boyu gedir. Palıd xaçın qarşısındakı skamyaya çatıb, burda küləkdə, yaz soyuğunda bir-iki saat, yüngül çəkmələrdə ayaqları və dar əlcəklərdə əlləri donana qədər oturur. Soyuqda şirin-şirin oxuyan bahar quşlarını və çini çələngdə küləyin səsini dinləyərək, bəzən düşünür ki, ömrünün yarısını verərdi, təki gözlərinin qarşısında bu ölü çələng olmayaydı.

Bu çələng, bu təpə, palıd xaç! Onun altında, xaçdakı qabarıq çini medalyonun içində ölümsüzlüklə parıldayan gözləri və bu təmiz baxışları indi Olya Meşerskayanın adına yapışmış o dəhşətlə birləşdirmək mümkündürmü? – Amma ürəyinin dərinliyində hər hansı ehtiraslı arzuya sadiq insanlar kimi balaca qadın da xoşbəxtdir.

Bu qadın – Olya Meşerskayanın müdirəsidir, həqiqi həyatı əvəz edən hansısa uydurmalarla yaşayan orta yaşlı qız. Başlanğıcda bu cür uydurması onun kasıb və heç nə ilə fərqlənməyən qardaşı idi – bütün qəlbini onunla, onun parlaq hesab etdiyi gələcəyi ilə birləşdirmişdi.

Qardaşı Mukden yaxınlığında öldürüləndə o, özünü ideya zəhmətkeşi olduğuna inandırırdı. Olya Meşerskayanın ölümü onu yeni xəyalların əsiri etdi. İndi Olya Meşerskaya onun təşvişli hiss və düşüncələrinin mövzusu idi. O, hər bayramda Olyanın qəbri üstünə gedir, saatlarla gözlərini palıd xaçından çəkmir, Olya Meşerskayanın tabutda, çiçəklərin arasında solğun üzünü və bir dəfə gizli qulaq asdığı söhbəti yadına salır: bir dəfə böyük tənəffüs zamanı gimnaziya bağçasında gəzərkən Olya Meşerskaya öz uzun boylu və dolu rəfi qəsi Subbotina ilə tez-tez danışırdı:

– Mən atamın kitablarından birində (onda belə məzəli kitablar çoxdur) qadında gözəlliyin necə olması haqqında oxumuşdum... Başa düşürsən, orda o qədər şey deyilmişdi ki, hamısını yadda saxlamaq mümkün deyil: qapqara, qaynayan qətran kimi gözlər, vallah, elə də yazılmışdı, qaynayan qətran kimi gözlər! Gecə kimi qara kirpiklər, zərifl iklə oynayan al yanaq, incə qamət, adi əllərdən uzun, başa düşürsən, adi əllərdən uzun! Balaca ayaq, böyük ölçülü sinələr, düzgün girdələnmiş baldırlar, balıqqulağı rəngində dizlər, maili çiyinlər, mən demək olar ki, çoxunu əzbər öyrənmişdim, bunlar necə də doğrudur! Amma əsas olan bilirsən nədir? Yüngül nəfəs! Axı bu, məndə var, sən bir dinlə, necə nəfəs alıram, doğrudan da var, elə deyil? İndi bu yüngül nəfəs buludlu səmada, soyuq bahar küləyində dünyaya yenidən yayılırdı.

1916

**Entoni Dor - "Yaddaş divarı"**




Alma ayaqyalın, pariksiz əlindəki fənərlə yuxarıdakı yataq otağındadır. Qonaq otağındakı saat tıqqıldayaraq gecəni başa vurur. Az əvvəl Alma çox əhəmiyyətli iş gördüyündən əmindir. Nəsə həyati əhəmiyyətli iş idi. Amma nə idi? Xatırlaya bilmir.

Pəncərələrdən biri açılıb. Qonağa aid yataq səliqə-səhmanla yığılıb, örtüsü hamarlanıb. Çarpayının yanındakı tumbanın üstündə mikrodalğalı soba boyda aparatın üzərinə pərçimlənmiş lövhəcikdə yazı var: "Keyptaun Yaddaş Tədqiqi İnstitu əmlakı". Ondan üç burulmuş kabel ayrılıb motosiklet dəbilqəsini xatırladan alətə gedir.

Alma ilə üzbəüz divarın hər tərəfinə kağız vərəqlər yapışdırılıb. Onların arasında diaqramlar, xəritələr, cızma-qaralarla qaralanmış əzilmiş vərəqlər də var. Orda təkcə kağızlar yoxdur: kibrit qutusu ölçüsündə plastik kartriclər də var, qapaqlarına dördrəqəmli nömrə həkk olunub və hər birinin üstündə olan dəlikdən divardakı mismarlara asılıb.
Almanın əlindəki fənərin işığı rəngli şəklə düşür, şəkildə şalvarın balaqları dizlərinə qədər qatlanmış kişi dəniz dalğaları arasından çıxır. Alma barmaqlarıyla şəklin kənarına toxunur. Kişinin üzündə təbəssüm, yoxsa qarmaqarışıqlıq ifadəsi olduğu bəlli deyil. Su soyuqdur. Bütün fotolarda

onun əli ilə - o bunu bilir - yazılmış imza var: Onun adı Harolddur. Bu kişi ona tanışdır. Gözlərini yumanda onun diş ətlərinin çəhrayı rəngini, boynundakı qırışları, əllərindəki düyünlü barmaqları xatırlaya bilir. Kişi onun əri idi.

Fotonun ətrafı isə kağız vərəqlər və kartriclərlə əhatə olunub. Dağılaraq, bir-birinin üstünə dairələr və qatlarla sürünərək, bəziləri mismarla, bir qismi sancaqla, digərləri isə saqqızla yapışdırılıb. Burada təcili işlərin siyahısı, qısa qeydlər, tarixdən əvvəlki hansısa heyvan və əjdaha təsvirləri var. Kağızlardan birində yazılmışdı: "Fekoya inanmaq olar". Onun yanındakında: "Koka-kolanı Pollidən götürmək". Yenə orada reklam: "Porter Properties Daşınmaz Əmlak Agentliyi". Qəribə sözlərə də rast gəlinir: "Deynotsefallar, Uzaq Perm dövrü, onurğalıların kütləvi qəbirstanlığı". Bəzi kağız hissələri boşdur, üstündə tələskənliklə silmə, düzəltmə və qaralama izləri görümək mümkündür. Hansısa kitabçadan qoparılmış səhifələrdən birində bir ifadə dəfələrlə vurğulanıb: "Xatirələr hüceyrələrin içində deyil, hüceyrələrarası sahədədir", bununla belə ifadənin altına çəkilmiş xətt qarmaqarışıqdır, sanki lazım olan əllə çəkilməyib.

Bəzi kartriclərin nömrəsinin az aşağısında yenə onun əli ilə yazılmış qeydlər var. Muzey. Dəfnlər. Hettinin evində əyləncə gecəsi.

Alma gözünü qırpır. O, nə vaxtsa kartriclərin altını yazmasını, kitabçalardan səhifə qoparmasını və divarlara nələrisə yapışdırmasını xatırlamır.

Gecə köynəyində divarın yanında dayanan Alma döşəməyə oturur və ayaqlarını uzadır. Qəfildən pəncərədən şiddətli külək əsir, kağızlar dirilir, sancaqlardan dartılaraq rəqs edir. Bəziləri qopub xalçanın üstünə uçur. Kartriclərdən güclə eşidiləcək cingilti səsləri gəlir.

Divarın mərkəzinə doğru yerini dəyişəndə fənərin işığı yenə dənizdən çıxan kişinin şəklinin üstünə düşür. O dəfəki təbəssüm, yoxsa qarmaqarışıq

üz ifadəsi deyil. Bu Harolddur, deyə düşünür Alma. O mənim ərim olub. O ölüb. Artıq illər keçib. Əlbəttə.

Pəncərəsinin çölündə, palma ağaclarının çətirinin arxasında, şəhər işıqlarının ötəsində okean; onun üzərində gah Ay, gah bulud. O gah işıqlanır, gah da qaralır. Xəfif gurultulu səslə vertolyot uçur. Palmalar titrəyir. Alma baxışlarını aşağı endirir. Əlində kağız parçası var. Üstündə yazılıb: "Hansısa kişi. Həyətdə ucaboy kişi".

**Kuzey Kayahan Saran - "Yara"**




*Kuzey Kayahan Saran 1986-cı ildə Türkiyənin Ədirnə şəhərində anadan olub. Psixologiya təhsili alıb. Müjdat Gezen Sənət Mərkəzi Konservatoriyası, Yaradıcı Yazıçılıq fakültəsindən məzun olub. Xüsusi olaraq din və fəlsəfə dərsləri alıb. Genealogiya üzrə araşdırmaları var. İstanbul Teatrında aktyor və ssenari müəllifi olub. Şeir, hekayə və yazıları müxtəlif dərgilərdə dərc olunub. Hazırda "Şahsiyet" dərgisinin baş redaktorudur. "Yara" hekayəsi yazıçının Yitik Ülke Yayınları tərəfindən nəşr olunan "İki ayaklı hüzün" kitabında yer alıb. Hekayənin tərcüməsini sizlərə təqdim edirəm.*

*"İndiyə qədər ürək ağrısına qulaqdan şəfa verildiyini eşitmədim".*
*Anton Çexov*

Ədalət olmayan ölkədə, onun beton səhrasına dönmüş bir şəhərində yaşayırdım. Qulaqlarımdan bitməyən bir uğultu yüksəlirdi. Dörd tərəfim ruhumu cırmaqlayan səslərlə doluydu. Ayaq səsləri, siqnal səsləri və tüfeyli həyat tərzini yaşamaq sanan insanların səsləri... Tanrının bu varlıqlara bəxş etdiyi həyatın içində ömrümün tükənməsinin səsini dinləyirdim. Yaşamaq üçün səbəblər axtarırdım. Avaralıqla keçən illərimə baxdıqda, yaxşı etmişdimmi, yoxsa pis, bilmirdim.

İndi hər kəs özünə bir şəxsiyyət donu geyindirmək dərdindədir. Mövqe və rahat yaşamaq üçün öz şəxsiyyətlərini yox sayıb, başqalarının şəxsiyyətsiz köləsi olmağı həyat zənn edirlər. İnsan özünə bu əzabı niyə versin ki? Bir anlıq yerimdə donub qaldım. Özüm haqqında düşündüm. Pəncərədən içəri əsən xəfif külək tərtəmiz nəfəsini ciyərlərimə doldurdu. Qatil vicdanıyla axan göz yaşlarıma toxundum. Özünə yol tapan bir damlanın ilıq və duzlu dadını dodaqlarımda hiss etdim. Töküldüyü anda qar kimi əriyib yox oldu. Zehnim kor quyudur. Düşüncənin itdiyi dünyada həyat üçün verilmiş sözdə onun boşluğunu sorğuya çəkirdim. O qədər yalqızam ki, göz qapaqlarımı belə oynadacağım gücü tapmıram. Küçələr, insanlar, ağ divarlar qusmağım üçün əllərindən gələni edirlər. Qıçlarıma toxunuram, necə böyük boşluqdur! Ömrüm boyu hiss edə bilmədiyim bir duyğunun kədərini yaşayıram. İnsan, heç olmayan hisslərin necə yaşanacağını dərk edirmi?

Dəhlizdən gələn ayaq səsləri yavaşca qırılmağa başlayan buz kimi qulaqlarımın dərisini qopardı. Yanımdakı qapı keçmişdən bir nişanə gətirmişcəsinə açıldı. Nifrət etdiyim addımlar parlaq döşəmədə hay saldı və dayandı. Həyatdan istədiyi nə vardısa, hamısını alan həkim qıçlarımın yerdəki boşluğuna əyildi. Toxundu. Əllərini hiss etmədim. Kefimi xəbər aldı, "Yaxşıyam!", dedim. Gözlərinə qan gəlmişdi. Gecə yaxşı yatmadığı bilinirdi. Çiynimə toxundu. "Yaxşı olacaqsan!", dedi. Dediyinə özü də inanmadı. Çox qalmadı. Söylədiyi sözlər kimi dəyərsiz varlığını da götürüb otaqdan çıxdı. Günəş pəncərəmdə şəhərlə vidalaşarkən, mən geridə qalanları dinləməyə davam etdim.

Məndən artıq qalanlarla...

**Melisa Kesmez - "Qarpız dilimləri"**




*Melisa Kesmez 1980-ci ildə İstanbulda anadan olub. "Atları bağlayın, gecəni burda keçirəcəyik", "Bəzən bahar", "Noxud otaq" adlı üç hekayələr kitabının müəllifidir. Müəllifin hekayələri qısa zamanda oxucular tərəfindən bəyənildi və sevildi. "Qarpız dilimləri" hekayəsi "Atları bağlayın, gecəni burda keçirəcəyik" kitabında yer alıb. Həmin hekayənin tərcüməsini sizlərə təqdim edirəm.*

Evə gəldiyimdə hər şey adi görünürdü. Həmişəki çərşənbə axşamı günündə olduğu kimi. Levent hələ gəlməmişdi. İşıqları yandırdım. Axşam azanı oxunurdu. Səhər çıxanda eyvanın qapısını açıq qoymuşduq. Çantamı qapının girişinə qoydum. Dəhliz dolabının aynasında özümə baxdım, saçlarım əməllicə uzanıbmış. Bir az kəsdirim, görəsən? Levent belə xoşlayır deyə bu fikirdən imtina etdim. Eyvana çıxıb siqaret alışdırdım. Mövsümlərdən yaydırsa, günün ən sevdiyim saatları deməkdir. Şəhərdə axşamüstüdür. Əvvəlcə pəncərədən içəri narıncı işıq dolur, divarları boyayır, yavaş-yavaş evin içində gəzişir, kölgələri uzadır, sonra sakitcə çəkilir, yerini axşamın bozluğuna buraxır və evlərin işıqları tək-tək yanır. Qarşıdakı binada axşam təlaşı vardı. Sarı işıqlı pəncərələrdə gəlib-gedən, oturub-qalxan siluetlər. Bütün günü şəhərin başqa bucaqlarında keçirib bu

saatlarda evlərdə toplaşan qələbəliklər. Ailələr, tələbələr, heç evlənməmiş subaylar, yaxınları köçüb getmiş ixtiyarlar.
Gözüm alt mərtəbələrə sürüşdü. Günün heç bir saatında televizorun işığının söndüyünü görmədiyim giriş mərtəbədəki mənzildə yaşayan yaşlı qadın qucağındakı sinidən axşam yeməyini yeyirdi. Yoldaşı yoxdur. Ölüb deyirlər. Gəlib gedəni olduğunu da heç görmədim. Yəqin oğul-uşağı da yoxdur. Ürəyim sıxıldı. Siqaretimi Leventin gözü kimi baxdığı ətirşahın torpağında söndürüb bağçaya atdım. Birini də alışdırdım. Görəsən, bir gün mən də onun kimi televizorun qarşısında, qucağımda sini ilə oturub qalacağam?
Gözlərimi beşinci mərtəbəyə çevirdim. Təkcə mətbəxin işığı açıqdı. Digər pəncərələrə dəhlizin tutqun işığı düşmüşdü. Gənc qadın canfəşanlıqla yemək hazırlayırdı. Nələrisə qarışdırır, soyuducunun qapısını açır, bağlayır, suyu açır, nəsə yuyur. Qab-qacaq səsi bizim eyvana qədər gəlirdi. Sısqa bir qadındı. Uşaq kimiydi. Çox olsa, 25 yaşında. Əri bir azdan gələcəkdi. Yeni ailə qurmuşdular. Məhəlləyə keçən ay köçmüşdülər. Cehizin daşınıb yerləşdirilməsi bir neçə gün sürmüşdü. Hələ ki, bir qəribəliklərini görməmişdik. Qadın bir yandan ocağın üstündəki yeməyi qarışdırarkən, digər yandan da pəncərədə görünən əksində saçlarını düzəldirdi. Onu sevirdi. Bu, onun əlini səliqə ilə daradığı saçlarında gəzdirməsindən, qayıq yaxalı köynəyini düzəltməsindən, evdə geyindiyi tərliklərdən anlaşılırdı. Hər şey onun üçün hələ yeni başlayırdı. Filmin ən həyəcanlı yerindəydi.
İkinci mərtəbənin pəncərəsindən bir qadın belinin yarısına qədər əyilib səsləndi: "Əmrə, tez ol, evə gəl! Atan gəldi!" Bir uşaq boynunu büküb, topa vurmaqdan hardasa partlamış toz içindəki ayaqqabılarını sürüyərək ovqatı təlx binanın qapısına doğru getdi. Arxasından başqa uşaq qışqırdı: "Anasının quzusu, tez ol, qaç evə!" Az sonra içəridən quzunun anasını bağırtısı eşidildi: "Ayaqqabılarla girmə! Oraları yeni sildim!"
İçəri girdim. Ürəyim pomidor-yumurta çığırtması istədi. Yanında da qarpız. Birdən mərməhət duyğusuna qapıldım. Levent gələnə qədər stolun üstünü hazırlayım, deyə düşündüm. Həm də özümü əfv etdirərdim. Dünən axşam yenə eyni mövzudan söz açılmışdı, mən fikrimdə israr edincə o da incimişdi. Eyvanda gözəl süfrə açacam. Qarşılıqlı oturub

ləzzətlə yeyəcəyik. Harda qaldı bu kişi? Yəqin tıxaca ilişdi. Soyuducudan pomidorların əzilməyə başlayanlarını seçdim. Rəndələyərək hazır etdim. Levent gələr-gəlməz yağı qızdıraram. Bibərləri də qoyaram, çığırtma iki dəqiqədə hazır olar. Sonra mətbəx dəzgahının üstünə qəzet sərdim, qarpızı tən ortasından ikiyə böldüm. Nə gözəl qoxudu. Yarısını doğradım. Soyuducunun buzluğuna qoydum. Levent gələnə qədər gül kimi olacaq. Sonra salona keçdim. O gələnə qədər barı xəbərlərə baxım, dedim. Ölkədə yenə axmaq bir gün keçib. Hər dəfə izləməyim, deyirəm özümə, yenə dözmürəm. Heç bir şey yaxşılığa doğru getmir. İnsanlar necə cəsarətlidirlər, çoxlu uşaq doğur, həyatın içinə atırlar. Bir uşağa baş verənləri necə başa salasan? İnönündə, Levetin də getdiyi son matçda polis uşaq-muşaq demədən, tərəfdarların üstünə qaz sıxmışdı. Onlarca balaca tələf olmuşdu. İnsan, övladını hara getdiyi bilinməz dünyanın ortasına necə buraxsın? Hər il dəyişən tədris planına onların körpə ağlını necə əmanət etsin? Leventi də başa düşürdüm. Ata olmaq istəyirdi. Amma mən ana olmaq istəmirdim. Uşağı gətirəcəyim dünyanın mənasızlığını keçsək, mənim ev, iş və Miqros arasında keçən, qaşlarımı aldırmağa belə vaxt tapmadığım dopdolu həyatımda uşağa yer vardımı? Bir saxsı çiçəyi böyütməyə aciz, bir qazan yemək bişirməyə yorğun. Uşaq belə həyatın harasına sığacaqdı? Onu da haqlı sayırdım. Ancaq başdan bu cür danışmamışdıq. Ailə qurmazdan qabaq uşaq istəmədiyimi demişdim. "Yaxşı", "İkimiz olsaq, kifayətdir", demişdi. Yaşım 35 olub. Bu qədər ili fərah-fərah, səs-küysüz, gül kimi yaşamışıq. Yox, qəti qərarımdır. Uşaq istəmirəm. Özümlə güclə yola gedirəm. Levent bu sevdasından imtina edəcək, başqa çarəsi yoxdur. Bilirəm, əsəbiləşir, üzülür, amma ehtiyac yoxdur.

Üçlü kürsüdə yatıb qalmışam. Təşvişlə oyandım, qaranlıqda əlimi gəzdirərək telefonumu tapdım. Zəng edən yox idi. Saata baxdım. 05:17. Televizorda köhnə kovboy filmi gedirdi. Hansı film olduğunu xatırlamadım, ancaq dəqiq əvvəl izləmişdim. Birdən ağlıma Levent gəldi. Kürsüdən sıçrayıb otağa qaçdım. Ədyalın altında büzüşmüşdü. Yəqin üşümüşdü. Bir ayağı çölə çıxmışdı. Yatağın mənim olan tərəfi heç pozulmamışdı. Aramla nəfəs alıb verirdi. Yuxusu dərindi. Görəsən, yemək yedi? Mətbəxə getdim. İşığı söndürməmişəm. Eyvanın qapısı hələ də aralı

qalıb. Qarşıdakı bina qaranlığa qərq olub. Küçədə səs yoxdur. Yaşlı qadın belə yatıb. Rəndələdiyim pomidorlar qoyduğum kimi mətbəx dəzgahının üstündədir. Qabıqları da necə buraxmışamsa, Leventi hisrləndirəcək şəkildə, mətbəx çanağının içindədir. Birdən ağlıma qarpız dilimləri gəldi. Tələşla soyuducunu açdım. Buzluqdan çıxardım. Daş kimi olmuşdu.

**Hakan Bıçakcı -"Rufus Ueynraytın sənin toyunda nə işi var?"**




*Hakan Bıçakcı 1978-ci ildə İstanbulda anadan olub. İlk və orta təhsilini İstanbulda tamamladıqdan sonra, 1996-cı ildə ali təhsil almaq üçün Ankaraya gedib. 2001-ci ildə Bilkent Universiteti İqtisadiyyat fakültəsini bitirərək İstanbula qayıdıb. İlk romanı "Romantik qorxu" 2002-ci ildə nəşr olunub. Müxtəlif qəzet və dərgilərdə ədəbiyyat, film, populyar mədəniyyət yönümlü yazıları və hekayələri yer alıb. "Bina boşluğu" kitabı bir neçə dillərə tərcümə olunaraq oxuculara təqdim edilib. Yazıçının indiyə qədər 9 kitabı çap olunub. "Rufus Ueynraytın sənin toyunda nə işi var?" hekayəsi "Hekayədə böyük boşluqlar var" kitabında yer alıb. Hekayənin tərcüməsini sizlərə təqdim edirəm.*

*Nə etdiyimi bilmirəm.*
*Nə dediyimi bilmirəm.*
*Niyə izlədiyimi bilmirəm,*
*Rəqs edən bütün bu bəyaz insanları.*
*- Rufus Ueynrayt*

Yeddi illik münasibətim iki gündə sona çatdı. Əvvəlcə hardan çıxdığı məlum olmayan basmaqəlib "Düşünməliyəm" söhbəti yarandı. Sonrakı

gün daha pis, daha böyük çeynənmiş: "Ayrılmaq istəyirəm" cümləsi keçdi. Üç ay sonra da xəbər gəldi: Ərə gedir. Kişinin çox varlı olması haqqında söz-söhbət də çıxdı. Bu nədir, a kişi? Yeşilçam filmi kimi... Məni bir Mersedesə satdı?
Bir həftə sonra yeni xəbər gəldi. Bu dəfə daha maraqlı irəliləmə var... Toylarına Rufus Ueynraytı gətirirlər. Çıxıb mahnı oxuyacaqmış. "Vay səni, kişi doğrudan da zənginmiş", ilk reaksiyam bu oldu. Dostlarım lağ etməyimə sevinərək keflərini pozmadılar. Necə dostdur bunlar? Rola girmişəm. İçim parçalanır. Hardasa ürəyim dayanacaq. İş ciddi idi. Ağlamamaq üçün masaya yayxanıb lağ etməyə davam etdim: "Rufusa bax hələ. Ac köpək. Kanadadan qalxıb İstanbula oxumağa gəlir. Yox bir, gəlinlə bəyin ayaqlarını da yuyaydın barı".
Evə qayıdınca elə bir hüzün çökdü ki, nə bu çökən tam olaraq hüzündü, nə də bu hissin daxilimdəki hərəkəti çöküşə bənzəyirdi. Rufus Ueynrayt onun ən sevdiyi musiqiçi idi. Onun mahnılarına və səsinə qarşı böyük marağı vardı. Məni də tanış etmişdi onunla. İlk əvvəllər çox ağlamalı gəlmişdi, amma nə yalan deyim, sonra yavaş-yavaş qanıma işlədi. Bir göz qırpımında Ankaralı metalistdən İstanbulda yaşayan, Rufus Ueynrayt dinləyən üst səviyyəli sevgiliyə çevrildim. Pivə yerinə şərab içdim. Səhərlər də yuxudan oyanar-oyanmaz çay yerinə qəhvə... Oxuduğum qəzeti belə dəyişdirdim. Ankaranı tərk edib onun yanına köçdüm. İş yox, güc yox. Hər gecə səhərə qədər Rufusun təsiredici mahnılarını dinləyərək öpüşdük, sevişdik və xəyallar qurduq.
Biz maqnitofon lenti müşayiıtində ziddiyyətli xəyallar qurarkən, indi o, Rufusun canlı ifa müşayiətilə ərə gedir. Bu nə cür absurd məğlubiyyətdir? Romantikliyin haqqını belə verirlər. "Qardaş, kişi çox zənginmiş". Zəngin də sözdür? Əslində onun pul-paraya olan hərisliyini həmişə hiss edirdim. İndi ağlıma bir nümunə gəlmir. Hərisliyini hiss edirdim, amma övladının şikəstliyini görməyən ana kimi gözardı edirdim. Mən kompüterin İP-sini dəyişdirib qaçaq yolla musiqi albomlarını yükləyərkən, kişi Rufusu qızın ayağına gətirib. Toyunda oxutduracaq. Oxu Rufus! Yenə oxu! Bir də türk dilində oxu! "Kimlər gəldi, kimlər keçdi", gəlsin!
Yaralı heyvan kimi evə qaçdım. Harasından vurulduğunu anlamayan, lakin öləcəyini hiss edən köpək kimi... Səni dişləyən köpəyə dönüb

baxmayan, onurğası ikiyə ayrılmış pişik kimi... Artıq bu şəhərdə qalmaq olmaz! Əlimi böyük bir şövqlə cibimə saldım. Sonun çatdı, Rufus! Xəyanət etmiş sevgilisinin telefon nömrəsini silən ərköyün qız kimi Rufus Ueynraytın albomlarını bir-bir sildim. Ankaraya qayıtdığım yolda, yol boyu Slayeri dinlədim.

**Yusuf İdris - Çuxurlaşmış döşək**



Zifaf gecəsində yatağın döşəyi təzə, hündür və elə gözəl düzəldilmişdi ki, uzun, iri bədənini döşəyin üstünə sərdi; görünüşü, yumşaqlığı xoşuna gəlmişdi.

Pəncərənin yanında dayanmış arvadından:

- Bax, gör, dünya dəyişibmi?, - soruşdu.

Arvadı pəncərədən baxıb:

- Yox, dəyişməyib, - dedi.

- Bir gün yataq barı.

Bir həftə yatdı, oyandıqda bədəni döşəyi bir az yapıxdırmışdı.

Gözünü arvadına dikib:

- Bax, gör, dünya dəyişib? - soruşdu.

Arvadı yenə pəncərədən baxıb:

- Yox, dəyişməyib, - dedi.

- Bir həftə yataq barı.

Bir il yatdı, oyandıqda bədəninin döşəkdə yaratdığı çuxur daha da dərinləşmişdi.

Arvadından:

- Bax, gör, dünya dəyişibmi? - soruşdu.

Arvadı təkrar pəncərədən baxıb:

- Yox, dəyişməyib, - dedi.

- Bir il yataq barı.

On il yatdı. Döşək də onun bədəninə görə dərin çuxur yaratdı. Sən demə, kişi ölüb, üstünə örtük çəkəndə döşəyin səthi elə olub ki, sanki üstündə heç bir oyuq yoxdur, düzləşib.

Ölmüş kişini saran və məzara çevrilmiş döşəyi daşıyıb küçənin bir qırağına atıblar.

Məzara çevrilmiş döşəyin tamam kirəcləndiyini izləyən arvadı pəncərədən baxıb gözlərini səmada dolaşdıraraq:

- Allahım! Artıq dünya dəyişib! - dedi.

**Necati Tosuner - Sonra...**



asanın ortasında bir kitab vardı. Boşqabların, bardaqların arasında, sobadan yeni çıxmış çörək kimi - yenə də sakitcə - qərar tutmuşdu. Axı niyə sakit olmasın?..

- Təsəvvür edirsən, - dostuma dedim - kitabımın çıxmasına da sevinmədi!

Dostum baxdı. Kitaba da baxdı. Eynəyini ortasından itələdi, bir şey demədi.

- Sevinmir də yox e, daha pisi, - dedim - sevinə bilmir!

Yenə eynəyini itələdi dostum, - əsəbiləşmişdi. Bunu mənə bildirmək istəmirmiş kimiydi.

- Ancaq ssenaridə bu yoxdu, - dedim, - bax, hardan hara gəldik!.. Hə,

birlikdə yaşlanmağa hazırlanırdıq axı...

Dostum boynunu bir az bükdü, iki barmağını gicgahına dayayıb, eləcə qaldı.

- Anlaya bilmirəm, - dedi sonra - heç anlaya bilmirəm... Necə belə...

- Gəl, bir qurtum içək, - dedim.

- Kitabı islatmaq olsun, - cavabını verdi.

- Hə, kitabı islatmaq üçün, - dedim - boşanmağı islatmayacağıq ki...

- Çox insan boşanmağı isladır, - dostum dedi.

- Eləmi?..

Sonra susduq.

Tez-tez gəldiyimiz yerdi. Bağçanın oturduğumuz hissəsi şam ağaclarıyla əhatəliydi. Bir-iki masa ancaq doluydu. Daxili hissə isə nahar yeməyi yeyənlərlə ağzınacan tutulmuşdu. Yaxınlardakı iş yerlərində çalışan, çoxu gənclərdi.

Sonra qarşıdakı məsciddən azan oxunmağa başladı. Səssizcə içməyə davam etdik. Azanı dinlədik, özümüzü dinlədik. Yetişhayetişdə olan yaya baxdıq.

Sonra heç olmayan şey oldu: ağacın biri mənə göz vurdu.

Baxdım, hə mənə!

Bağçanın ortasında, bir-birlərinə xüsusilə yaxın olmağı seçmiş kimi dayanan iki ağac vardı. Daha çox da şaftalı ağacına bənzəyirdilər. Çiçəkləri

"Mən şaftalıyam!", deyirdi.

Yox, yanılmırdım. Göz qırpırdı.

Yavaşca dostuma dedim ki:

- Mənə göz vurur...

Dostum gizlicə şüşədəki görüntüləri baxışlarıyla gözdən keçirdi, sonra mənə doğru əyilərək soruşdu:

- Hansı?

- Daha narın olanı...

- Sarışın olan, hə? - soruşdu.

- Yox, əşi, qızlar deyil, - dedim - ordakı şaftalı ağacı.

Dostum şüşənin dərinliyinə diqqət edib, ağacları seçdi.

- Mənə göz vurur, - dedim.

- Şaftalı ağacı, hə?

- Hə, - dedim.

- Bəlkə şaftalı deyil. Mənə göz vurur.

Dostum bardağını uzatdı:

- Yaxşıdır ki. Sən də ona göz vur!

Güldük.

Baxdım ki, zərif iki şaftalı ağacıydı - və bütün bağçadan sanki uzaq idilər. Sonra dostum hesabı ödədi. Çıxanda yerdəki dörd barmaq betondan dostum aşağı büdrədi, yıxılmamaq və eynəyini xilas etmək üçün daha da sürət qazandı və... yuvarlandı irəliyə!

Kölgə yerə çəkildi, ayağını tutub, bir az qıvrandı.

- Durduğum yerdə... - dedi.

Yenə də özümü tuta bilmədim:

- Beton sənə göz vurdu, - dedim.

Əvvəlcə mənə bir baxdı, sonra gülməyə başladı.

Sonra da dedi ki:

- Az qala başımı partladacaqdı!

***

Ay çox gözəldi. Göydə "ay!" dedirdəcək ay vardı. Heyrətlənmək belə şeydi. Əlli yaşında təəccüblənmək isə daha başqa şeydi. Sanki başqa şey yoxdu. Bəli, heç bir şey yoxdu. Çox böyük ay vardı. Tənhalıq vardı. Sanki heç nə yoxdu, - tənhalıq vardı. Evin yolu nə üçün gözəldi?.. Sən hardaydın?.. Evdəydinmi?.. Sən məni tərk etmədinmi?.. Sən...

Heç işıq yanmırdı.

***

Ertəsi gün dostumun işlədiyi yerə zəng vurdum.

Xanım köməkçisi:

- Siz eşitmədiniz? - dedi.

- Ayağı... – dedi. Xəstəxanada... - dedi.

Şəhərin qarşı tərəfindəki xəstəxanaya yetişməyim tam iki saatımı apardı. Bəli, ayağı gipsdəydi və imza toplayırdı.

- Çox pisdir? – soruşdum.

- Yox, - sadəcə çatlayıb.

Gipsi xəfifcə oxşadım. Uşaqlığımdakı gipslərə oxşamırdı - parlaq idi.

Yaxşı ki, danışdıqlarımın hamısı həqiqətdə olmadı.

İndi bu sualı soruşmağın tam yeridir:

Hansılar oldu... olmadı hansılar?..

**Kuzey Kayahan Saran - "Satılıq ağlaşma"**

*"Səsim yoxdur. Səsimi qaranlığın qarnında itirdim.*
*Bəlkə də, kor quyuda unudulan Yusifdim!"*
*Əhməd Telli*

Anam Hüsnadan çox bəhs etmişdi. Mənə maraqlı gələn bu qadını ilk dəfə qonşularımızdan birinin yas mərasimində gördüm. Ölümü gözləyən, özünü buna bütün varlığıyla hazırlayan bir qadındı. Ölüm xəbərini qayğıdan uzaq qonşumuz gətirmişdi. Anam da bu xəbəri təəccübsüz qarşılamışdı. Elə bil bu xəbəri hər an gözləyirdi. Mənə görəsə elə də əhəmiyyətli hadisə deyildi. Televizorda onus zda hər gün yüzlərlə uşağın hardasa öldürüldüyünü görürdüm. İndi isə yas mərasimini canlı seyr

etmək mənə çox maraqlı gəlmişdi. Ölünün mum kimi solmuş üzünə baxmaq, arvadının, qızlarının onun arxasınca necə ağladıqlarını, ağı deyən qadınların əzbərlədikləri sözləri necə çığıra-çığıra dediklərini eşitmək üçün, qonşu uşaqlarıyla bilrikdə yas mərasiminə getmək mənə də qismət oldu.
Balaca qız dostumla əl-ələ tutub, hər kəsin maraqla gözlərini dikdiyi qapının dibinə soxulduq. Amma Hüsnanın yekə əli uşaqların boynuna toxunanda qapının önü o dəqiqə boşaldı. Hüsna boşaımış yerə özü keçdi. Evin içərisi tamamilə doluydu. Üzünə kədər ifadəsi vermək üçün Hüsnaya sadəcə bir saniyə bəs etmişdi. Cibindən başına bağlayacağı qara rəngli tülbəndini çıxardı. Ardınca daxilimi bürüyən qorxunc harayla qadınların arasından özünə yol açdı. Əl-üzünü ovuşdurdu. Həmin an sifəti bayram günlərində işinə fasilə verən bazar adamlarının üzü kimi olmuşdu. Ölünün baş tərəfinə gedib çatdı və yeni bir qiyyə çəkdi. Qadınların dolu-dolu göz yaşıyla söylədiyi sözləri o, yüksək səslə oxuyaraq bağırır, sinəsinə döyürdü. Sanki təkcə bu ölüyə deyil, kəndin bütün ölülərinə eyni anda ağlayırdı. Elə ağlayırdı ki, ölənin arvadı, bacısı və uşaqları belə onun bu acısının yanında əskik qalmışdı. Hıçqırıqların heydən saldığı qadınların səsi bir qədər səngiyəndə, Hüsna kədərli ifadəylə ölünün necə yaxşı insan olduğundan danışır, ardınca növbəti çığırıq səsi qopurdu. Yenidən göz yaşlarını tökür, sızıldamalar başlayırdı. Kədər son həddə çatırdı. Belə kədərli günlərdə baş rolu Hüsna oynayırdı. Dili yorulmaq bilmirdi. Səsi bayquşun səsinə bənzəyirdi. Kədərli görünmək qabiliyyəti əvəzsizdi. Göstərdiyi canfəşanlığa görə mükafatı da layiqli olmalıydı. Bunun əvəzində bitib-tükənməz dərin kədərinə dəyə biləcək, işinə yarayan müəyyən miqdar pul almalıydı.
Hüsnanın ölünü aparmaq üçün gələn adamlara yalvarışını hələ də xatırlayıram. Həmin anda tabutçulardan biri çilədən çıxmış vəziyyətdə araya girib Hüsnanı arxaya doğru itələdi. Dostlarının da köməyindən faydalanaraq tabutu yerdən qaldırdı. Həmin an tabutu yola salmaq üçün qara dəsmallar arxasından kədərlə sallanırdı. Ağlayan o qədər səsin içərisində ayırd edilə bilən yeganə səs Hüsnanın çığırıq səsiydi. Ölü, çiyinlər üzərində yavaş-yavaş uzaqlaşdırıldığı zaman, yan tərəfdəki bağçada qurulmuş yemək masalarına doğru ilk qaçan şəxsin Hüsna

olduğunu da xatırlayıram. Hər şeyi bir tikədə mədəsinə endirirdi. Həmin gün başa düşdüm ki, Hüsna başqa qadınlara bənzəmir. Dağılmış saçları, qorxunc yekə əlləri və böyük ağzı gözlərimin qarşısından getmirdi.
Hər dəfə kiminsə öldüyünü əvvəlcə o öyrənirdi. Anam başsağlığına gedə bilmədiyi zaman, onun marağına səbəb olacaq mənzərəyə şahid olmaq həvəsiylə dostumla ölü evinə qaçırdım. Hüsnanın özü mənə ölüdən daha maraqlıydı.
Hüsna mənə elə görünürdü ki, sanki bütün ziyarətçiləri onların kədərinə ortaq edir, yaşlı ana-ataların yaralarını deşir. Nizamlı olaraq dediyi sözlərin müşayiətiylə, sinəsindən sifətinə, sifətindən başına şiddətlə vurduğu zaman əllərini izləyirdim. Onda gözlərim yerindən oynayırdı.
Zaman axıb gedirdi. Bir gün Hüsnanı toyda gördüm. Gözlərimə inanmadım. Saçları eyni idi: qıvrım, qara rəngli, daranmamışdı. Eyni çirkin üzü makiyajla bəzədilmişdi. O qədər ənlik-kirşan istifadə etmişdi ki, sifəti arxasınca ağladığı ölülərin üzü kimi ağappaqdı. Gözləri sanki böyümüşdü. İçimdən ürpəndim. Qolları bilərziklərlə doluydu. Yas mərasimi ticarətinin qazanclı olmadığını söyləyənlər həmin an əlimə düşməsələr yaxşı idi. Qəhqəhə ilə güləndə ağzı olduqca geniş açılırdı və yarıaçılmış ağzı təkcə saralmış dişlərinin arasında iri saqqızı çiynəmək üçün qapanırdı.
Həmin gün Hüsnanın yas mərasimlərindən başqa toylarda da qoçaq olduğunu gördüm. İş səhər tezdən başlamışdı. Yapışqan mumun köməyilə gəlinin tüklərini yolurdu. Ona pıçıldayaraq (ya da ən azından pıçıldayırmış kimi görünürək) evliliklə bağlı məsləhətlər verirdi. Əgər gənc qız utanıb qızarırdısa, bərk qəhqəhə çəkir, məsxərəyə qoyur, onu iki-üç gecədə ustaya çevirəcəyini deyirdi. Yuyunarkən ətirli sabun istifadə etmək, üzünə bir qədər krem çəkmək gəlinə kifayət idi, ətir mağazasından, ya da ən yaxşısı, Hüsnadan satın ala bilərdi.
Axşam bəzənib-düzənib gələn qadınlar gəlinin başına toplaşanda Hüsna xalq mahnıları oxumaqdan ötrü sino gedirdi. Elə ucadan bağırırdı ki, elə bil göyləri deşmək istəyirdi. Rəqs zamanı yaddaqalan hərəkətlərlə oynayırdı. Qadınları gülməkdən qəşş etdirən sənli, mənli zarafatlar edir, gah ora, gah bura sıçrayırdı. Bəyin, qadınların “Vaxtdır” sözü mənasında göz-qaş etmələrindən sonra nişanlısını aparmaq üçün gəldiyi zaman, Hüsna nişanlıları otağa aparmaq vəzifəsini də ələ keçirib, qapıda keşik

çəkmək haqqına sahib olmuşdu. Zifaf gecəsi qapıda dayanmaq üçün niyə israr etdiyini başa düşmürdüm.
Toy başa çatanda Hüsna qadınların arasından cibi dolu uzaqlaşmışdı. Əlbəttə, qızı Məsudənin toyunu yaxın günlərdə görmək arzu-diləyini ardınca aparmışdı. Çünki qızının toyu Hüsnaya görə, ən gözlənilən şeydi. O qədər bilərziyi, növ-növ ləl-cəvahiratı məhz ona görə yığırdı. Toy və yaslarda yığdığı bu bu cəvahiratı qızından başqa kimə verəcəkdi ki?
Tale bu sevinci yaşamağına mane oldu. Heç unuda bilməyəcəyim yay günlərindən biri idi. Tifo mikrobu, sanki Hüsnaya qonaq gəlmişdi və "bu mövsümü digərlərindən fərqli olsun" deyə düşünmüşdü. Günəş kimsə ölmədən çıxmırdı. Tifo Məsudədən yapışmışdı. Mikrob bağırsaqlarının dərinliyinə qədər getmişdi. Ölüm çox gözləmədi və qızın üstünə atıldı. Hüsnanın dualrını Tanrı geri qaytardı. Bir səhər kənd camaatı Məsudənin öldüyünü öyrəndi. Məsudənin ölümü hər kəsin marağına səbəb oldu. Hüsna qızı üçün necə ağlayacaqdı? Görəsən, hansı ah-vay səhnəsini hazırlayacaqdı? Bəs tamaşaları məhəlləni alt-üst edə biləcəkdimi?
Ona gərəkli olan göz yaşlarını, sızıldamaları göstərməyə tələsən qadın izdihamına qoşulub kədər qarışıq maraqla Hüsnanın evinə doğru qaçdım. Tək otağın içində iyirmidən çox qadın oturmuşdu. Qalanları ayaq üstə gözləyirdilər. Başların üstündən Hüsnanın üzünü axtarmağa başladım. Ağlamırdı. Heyrətim daha da artmışdı. Kədərliydi. Səssizcə otağın bir küncündə oturub yerə baxırdı. Başına qara rəngli tülbənd bağlamışdı. Sinəsinə vurmur, paltarlarını cırmırdı... Onu ilk dəfə hissə qapılmayan halda görürdüm. Onda ölümə yaxın olan, iztirab çəkən birinin simasını görürdüm.
Həmin anda hiss etdiyi kədər səssizdi. Bir neçə qadın bağırıb çığırmaq istədi. Hüsna hiddətlə onlara baxdı. Qadınlar baxışlarından narahatlıq duyub susdular. Balaca Məsudənin ölüsünü aparmağa gələn adamların üstünə də bağırıb-çığırmadı. Qızının sakitcə evdən çıxarılmasını seyr etdi. Əvvəlcə məscidə, ordan da qəbiristanlığa arxalarınca divanə kimi getdi. Adamlar balaca Məsudənin üstünü torpaqla örtəndə, başını məzarın üstünə qoydu və oradaca qaldı.

**Melisa Kesmez - "Balıq peçenye"**




Zəngi çaldıq. Bu, son səkkiz ildir yaşadığımız, iki ay yarım qabaq anamın gecənin yarısında bizi oyadaraq tələm-tələsik tərk etdiyimiz evin qapı zəngi idi. Atam "Uşaqlar üçün çox darıxdım" – xəbərini göndərmiş, "Görmək istəyirəm" – demişdi. Atama baş çəkib çıxacaqdıq. Anam aşağıda – maşında gözləyirdi. "Çox qalmaq olmaz, dəcəllik etmək və arxa otaqlara keçmək də olmaz" – deyə söz almışdı bizdən.

– Qardaşına nəzarət elə! – biz yuxarı mərtəbəyə qalxan pilləkənləri çıxarkən arxamca səsləndi.

Qapı açıldı. Atamdı. Saqqalı uzanmış, çallaşmış, özü də bir az arıqlamışdı. Bizi görən kimi gülümsədi, ayaqqabılarımızı vərdiş etdiyimiz kimi qapıda çıxarmağa çalışarkən:

– Gəlin, gəlin! – dedi.

Qəribəydi, səkkiz ildir yaşadığım evə ilk dəfəydi ayaqqabı ilə girirdim. İçəri girər-girməz "Anam görsə havalanar" düşüncəsiylə narahatlıqla barmağımın ucunda gəzməyə çalışsam da, artıq buranın anamın evi olmadığını, onun qay dalarının çoxdan hökmünü itirdiyini başa düşdüm. Bura həmin ev deyildi. Başqa evdi. Atam da, sanki eyni adam deyildi.

Geniş otağa keçdik. Otağın vəziyyəti qəribəydi. Pərdələr örtülüydü. Televizor işləmirdi. İçəridən turşməzə iy gəlirdi. Yemək masasının ağ örtüyü ortaya qədər açılmış, açıq qalan hissəsinə qəzet sərilmişdi, üstündə yumurtası çörəklə siyrilmiş tava, dibində çayı quruyan bir neçə stəkan vardı. Yerə isə iki torba dolu boş pivə şüşəsi, boşalmış siqaret qutuları, zir-zibil tökülmüşdü. Ətrafda topa dönmüş corablar, oturacaqların arxasına asılmış növbənöv köynəklər, kostyum vardı. Bu tərəfdə anamın krujevaları, bənövşələri, tünd qırmızı rəngli kreslo dəsti, iç-içə girmiş yazı masaları, servantın içinə diqqətlə düzdüyü büllur stəkanları... Anamın hər şeyi elə yerindəydi.

“Bir iynəsini də istəmirəm" – anamın iki gün əvvəl mətbəxdə nənəmə dediyi sözü mən də eşitmişdim, “Qoy, hər şey onun olsun!”
Arxa fonda anamdan qalmış əşyalar, qarşıda dul atamın çiyinlərinin sallanmış yalqızlığı... Bu, illər sonra bütün xırdalığıyla xatırlayacağım bir mənzərəydi. Yad insan kimi bir küncündə qısıldığım divanda qarşımda gördüyüm, körpə uşaq qəlbimi parça-parça edən bu təzadı unutmaq olardımı? O vaxtın dəbinə uyğun mərmər yazı masasının üstündə təkcə qonaqların siqaretlərinin külünü tökmək üçün qoyulmuş böyük büllur külqabı ağzına qədər siqaret kötüyü ilə doluydu. Atam qırış- qırış köynək və uzanmış saqqalda çəhrayı çiçəkli pərdənin qarşısında əlindəki siqaretin külünü büllur külqabıya silkələyirdi. Anamın qabardaraq forma verdiyi yastıqlar yapıxıb çarpayıya yapışmışdı. Başdan-ayağa otağa döşənmiş gül naxışlı xalının bir vaxtlar dəcəllik edib ora-bura qaçanda zərər verdiyimiz saçaqları indi çox bədbin görünürdü. Monstera bitkisinin susuzluqdan boynu bükülmüşdü. Pərdənin bir ucu karnizdən xilas olub, özünü asmış uzun donlu qadın kimi havada sallanırdı.
Atamın qəhrəman deyil, adi insan olduğunu fərq etdiyim ilk an qarşımda qılıncını yerə qoyduğu, plaşını çıxarıb oturacağın üstünə asdığı andı. Həmin məqam xatirələrim içində ən kədərlisidir. İndi o, küçədə gördüyüm adi adamlardan biriydi. Daha qara gözləri parıldamırdı. Alt dodağıyla siqaretdən saralmış bığını dişiylə tutub gəmirir, çiyinləri salxmış halda yerə baxırdı. Söhbətə haradan başlayacağını fikirləşərkən, getdikcə siqaretinin külü uzandı, sonda anamın ağ rəngli krujevalı masa örtüyünə

düşdü. Külün düşdüyünə fi kir vermədi. Atam kədərli və yorğun görünür, amma bunu gizlətməyə çalışırdı. Mən də onun üzgün olduğunu başa düşdüyümü bildirmədim. Qarşılıqlı "Hər şey qaydasındadır, mən yaxşıyam, fi kir eləmə" oyunu oynayır, könülsüzcə gülümsəyirdik. Haqqında danışmalı, cavab tapmalı olduğumuz xeyli sual içimizi yandırırdı.
– Aclığınız var? – nəhayət, adi bir sual soruşmağın sevinciylə dedi.
Biz eyni anda "yox" mənasında başımızı yırğaladıq. Anamın qonaqlıq ədəb-ərkanı adı altında tez-tez xatırlatdığı tənbehlər arasında bu da vardı: "Acından ölsəniz belə, ac olduğunuzu deməyin, ayıbdır". Evimiz çoxdan başqasının evi olduğu üçün özümüzü qonaqlıqda hiss edirdik. Atam mətbəxə keçib iki litrlik fanta gətirdi, qarşımıza qoyub servantdan iki büllur stəkanı götürdü (anam onları yalnız qonaqlar gələndə istifadə edirdi). Təəccübləndik, çünki anam bizi fanta içməyə qoymurdu: "Vallah, dişləriniz tökülər" deyə qorxudur, ona görə də əlimiz qazlı içkilərə getmirdi. Ürəyimiz nə qədər istəsə də, sözə qulaq asıb içmədik. Atam kreslonun kənarındakı qara rəngli dükan sellofanlarının birinə əlini salıb nəsə axtardı, bir paket balıq peçenye çıxartdı, açıb qarşımıza qoydu. Tərəddüd etmədən qardaşımla hərəmizə bir dənə götürdük. Həmişə etdiyimiz kimi, balıq peçenyeni dişimizin arasında dikinə ikiyə bölüb növbəylə ağzımıza atdıq. Bizdən sonra hər şeyin tamamilə başqa ab-havaya büründüyü bu evdə keçmiş ayini həyata keçirmək şirin təəssürat yaradırdı. Tanış hissdir. Qardaşımla balıq peçenyelər kimi gülümsəyirdik. Deyəsən, içəri girdiyimizdən bəri ilk dəfəydi üzümüzə təbəssüm qonurdu. Qadağan olduğunu bilə-bilə fantanı büllur stəkandan bir qurtumda içirdik. Həyatımız boyu anamın qadağalarla dolu dünyasına zidd olan atamızın paralel dünyasında həyat hər zaman bayram olacaqdımı? Bunu bilmirdik. Bunun atamın sevgisindən, yoxsa atalıq bacarıqlarının yoxsulluğundan olduğunu isə heç vaxt bilməyəcəkdik.
Atam ikinci stəkanı doldurdu. Evə girərkən yaranan sarsıntısını yenib əhvalı yerinə gələn qardaşım zarafatlar etməyə başladı. Məktəbdə öyrəndiyi lətifəni danışırdı. Ona birlikdə güldük – atam, mən, qardaşım. Bizim evimizdə, anamsız gülürdük.

Bir qədər sonra çöldən siqnal səsi gəlir. Bu, anamın siqnalıydı. Qorxu içində ayağa qalxıb qapıya doğru qaçdıq. Qısa vidalaşma anı... Atamı qucaqlamadıq. O, saçlarımızı sığallayarkən əlindən qurtulduq, əli havada qaldı.

Qardaşım qabaqda, mən arxada pilləkənləri enərkən çevrilib arxaya baxdım, məhəccərin dəmirlərinin arasından son dəfə atamı gördüm, göz-gözə gəldik. Pilləkənləri qoşa-qoşa düşərkən:
– Anama heç nə danışma! – deyə qardaşımı tənbeh etdim.
– Əlbətt ə, – deyir. Kefi yerindəydi.
Binanın qapısından çıxarkən, bir ayağını örtülməməsi üçün ağır qapıya dayayıb,
bığ yerindən narıncı islaqlığı qoluyla silərkən:
– Fantanın, ümumiyyətlə, adını da çəkmə! – deyə pıçıldadı.
Necə də atama bənzəyirdi.

**https://www.ceylanmumoglu.com/**